# شَرْحُ السُّنَّةِ

# Düzgün etiqadın şərhi


Müəllif:

**Şeyxu-l-İslam İmam İsmail bin Yəhya əl-Müzəni**

Tərcümə:

***Əşyab əl-Qubavi əş-Şafi***

Redaktə:

**Samir Firdovsioğlu**

## TƏRCÜMƏÇİNİN MÜQƏDDİMƏSİ

Allaha həmd, Onun rəsuluna, rəsulunun əhli beytinə, səhabələrinə və qiyamətə qədər onların yolu ilə gedənlərə salam olsun! Bizi nemətlərin ən ucası olan iman nemətilə nemətləndirdiyi üçün gerçək hökm və hikmət sahibi Allaha sonsuz şükürlər edirik.

Tərcümə etməklə şərəfləndiyim bu risalə əhlus-sunnət val-cəməat əqidəsini aşılayır. Müəllifi imamımız əş-Şafinin tələbəsi İmam əl-Muzəni olan bu risalə "Şərhus-Sunnə" adı ilə tanınmışdır. Tərcümə etdiyim basqı Cəmal Azzun'un araşdırdığı və təhqiq etdiyi, Riyad Şəhərindəki "Məktəbətu Dəri-l-Minhəc" yayın evinin hicri 1430-cu ilin məhərrəm ayında nəşr etdiyi birinci basqıdır.

Azərbaycanda lazımi kitabları tapmaq imkansız hala gəldiyi üçün dostlarımızın yaratdığı bu imkandan istifadə edib kitabın tərcüməsini burada yayımlamaq qərarına gəldim. Başarı həqiqi hökm və hikmət sahibi olan Allahdandır.

***Əşyab əl-Qubavi***

İslamın, xüsusən şafi məzhəbinin xadimi

17 şaban 1432-ci il / 18 iyul 2011-ci il.

## İmam əl-Muzəninin qısa təcümeyi halı

Tərcümeyi halı Camal Azzun'un təhqiqi ilə olan basqıdan götürdük və kiçik əlavələr etdik

O, imamların imamı, sünnətin şeyxi, ümmətin fəqihi, himmət sahibi, şafi'ilərin şeyxi, insanların alimi İsmail bin Yəhya bin İsmail bin Amr bin Muslim əl-Müzəni əl-Misri əş-Şafi'idir. Künyəsi Əbu İbrahimdir. İmam əş-Şafinin yeni məzhəbini yayan ən böyük müctəhid imamlardan biridir. Hədis elmi, fiqh və digər elmlərin ustasıdır. Haqqında İmam əş-Şafinin "əl-Muzəni məzhəbimin nasiridir (yəni yardımçısıdır)" dediyi bu böyük zat İmam ət-Tahavinin dayısıdır. Muzeynə qəbiləsinə nisbət edilərək "əl-Muzəni" deyə tanınır.

İmam əl-Muzəni İmam Leys bin Səd'in vəfat etdiyi ildə, hicrətin 175 ci ilində Misirdə Fustat deyilən yerdə anadan olmuşdur. Elm və fəzilət ailəsində böyümüş, İmam əş-Şafinin ən yaxın tələbələrindən olmuşdur. İmamımız əş-Şafi onun haqqında buyurur: "O, şeytanla münazərə etsə onu susdurar." Həmçinin "əl-Muzəni məzhəbimin yardımçısı, nasiridir" demişdir. Haqqında İmam əl-İsnəvi və İmam İbnu-s-Subki "Tabəqat" da məlumat vermişlər.

**Şeyxləri.**

İmam əl-Muzəni İmam əş-Şafinin elm bulağından ən çox içən kəslərdəndir. İmam əş-Şafi Misirə gəlib o torpaqları şərəfləndirdikdən sonra İmam əl-Muzəni ondan ayrılmır. Onun tərbiyəsi ilə tərbiyələnən əl-Muzəni - "Mən İmam əş-Şafinin əxlaqından bir əxlaqam" - deyərdi. Şeyxlərini qısaca olaraq bu cür təqdim edirik:

1.İmamlar imamı, ümmətin günəşi, şafi məzhəbinin qurucusu İmam əş-Şafi.

2. Əli bin Məbəd bin Şəddad əl-Bəsri

3. Nueymm bin Həmmad

4.Əsbağ bin Nafi və başqaları.

**Tələbələri**

İmam əl-Muzəni rahimahullah bir çox tələbələr yetişdirib. Ən məşhurlarından bəziləri bunlardır:

1. İmam İbnu Xuzeymə əş-Şafi

2. İmam ət-Tahavi əl-Hənəfi

3. Əbu-l-Qasim bin Bəşşar  əl-Ənmati

4. Zəkəriyya bin Yəhya əs-Səci

5. Əbu-l-Həsən bin Cəusa

6. Əbu Nueym bin Adiyy

7. Əbu Muhəmməd Abdurrahman  bin Əbi Hatim ər-Razi və başqaları

**Əsərləri**

1. Şərhu-s-Sunnə və bu, tərcümə etdiyimiz əsərdir.

2. Cəmiu-l-Kəbir

3. Cəmiu-s-Sağir

4. əl-Mənsuru-l-Məbsut

5. əl-Muxtəsəru-l-Kəbir

6. əl-Muxtəsəru-s-Sağir (Muxtəsəru-l-Muzəni) və başqa əsərləri.

**Alimlərin onun haqqında dedikləri**

İmam əş-Şafi demişdir: ″əl-Muzəni məzhəbimin yardımçısı, nasiridir″.

İmam əş-Şafi yenə demişdir: ″O, şeytanla münazərəyə girsə onu yenər.″

İbnu Yunus demişdir: “əş-Şafinin əshabındandır. Fəzilət və ibadət sahibidir. Hədisdə etibarlıdır. Fiqhdən anlayış əhli onun elmində və fəzilətində ixtilaf etməyib.″

Əbu İshaq əş-Şirazi deyir: ″Zühd və təqva əhli birisi idi. Güclü münazərə sahibi, dəlil gətirməkdə aləm biri idi″

Hafiz İbnu Abdil-Bərr əl-Maliki deyir: ″əş-Şafinin ən elmli əshabından idi. Dəqiq fəhmli və fərasətli birisi idi. Kitabları və müxtəsərləri yer üzünün şərqinə və qərbinə yayılmışdır. Təqvalı, zahid və din sahibi biri, qənaətçil və qıt yaşantıya səbrli idi.″

Əbul-Fərəc İbnul-Cəvzi əl-Hənbəli deyir: ″əl-Şafinin əshabındandır. Alim və möhtəşəm istedadlı biridir. Hədisdə etibarlıdır. İbadət və fəzilət sahibidir. Allahın yaratdığı xeyirli kəslərdən idi. Daima ribatda olardı.″

İmam əz-Zəhəbi deyir: ″İmamdır, allamədir. Ümmətin fəqihidir və zahidlərin öndərlərindəndir.″

İbnus-Subki deyir: ″Şanı böyük bir imam, məzhəbin yardımçısı, məzhəbin səmasının ayı idi. Elm nəhəngi idi. Güclü münazərə və höccət gətirmə qabiliyyəti var idi. Zahid və təqvalı idi, dünyaya meyl etməyən, duası qəbul olunan birisi idi.″

**Vəfatı**

İmam əl-Muzəni hicri  264-cü ildə ramazan ayında Misirdə vəfat etmişdir. Allah rəhmət etsin.

## Tərcümə etdiyim basqının əsaslandığı nüsxələr

Camal Azzun’un basqısından alınma məlumatlar

Bu basqı üç nüsxəyə əsaslanaraq dəqiqləşdirilib:

1. Birinci nüsxə: Türkiyədəki Şəhid Əli Paşa kitabxanasındakı nüsxə; Mədinə İslam universitetinin məxtutatlar mərkəzində bu nüsxənin kopyası var və 1694 sayı ilə qeydiyyatdadır.

2. İkinci nüsxə: Şeyxus-Sunnə İbnu-l-Qayyim əl-Cəvziyyənin “İctimau-l-Cuyuşi-l-İsləmiyyə”adlı əsərində zikr etdiyi nüsxədir. Şeyx deyir: ”(İmam əş-Şafinin) **tələbəsi, öz zamanında şafiilərin şeyxi olan Əbu İbrahim İsmayıl bin Yəhya əl-Muzəni’nin sünnət** (din) **barədə, Əbu Tahir əs-Siləfinin sənədiylə ondan rəvayət etdiyi risaləsində zikr etdiyi söz. Biz də onu** (risaləni) **bütün ləfziylə zikr edirik”**[1]

3. Üçüncü nüsxə, kopyası Həmmad bin Muhəmməd əl-Ənsari’nin kitabxanasında olan nüsxədir.

[1] “İctimaul-Cuyuşil-İsləmiyyə”, səh: 166-170; təhqiq: Doktor Avvad Abdullah əl-Mutəq

**Kitabın İmamımız əl-Muzəniyə aid olmasının təvsiqi**

Risalənin imama aid olması yayda günorta çağında buludsuz səmadakı günəşdən daha aydındır, belə ki, kitabın ona nisbəti saysız sayda üləmadan sabitdir. Bunlardan biri İbnul-Qayyim əl-Cəvziyyə'nin ″İctimau-l-Cuyuşi-l-İsləmiyyə″ kitabında mətni tam zikr edərək, digəri İmam əz-Zəhəbinin "əl-Uluv" kitabında bir qismini zikr edərək ona etdiyi nisbətdir.

**Kitabın yazılma səbəbi**

Kitabın əvvəlində kitabı rəvayət edənin qeyd etdiyi kimi elm məclislərinin birində o zamanın əhli-sünnət alimləri elmi müzakirə edirlər və müzakirə əsnasında o zamanın əhli-sünnət imamlarının adını, İmam əş-Şafini, İmam Maliki, İmam Əhmədi, İmam Əbu Hənifəni, İmam əl-Əvzai'ni, İmam əs-Səvri'ni və digər alimlərin adlarını çəkirlər. Bu adı sadalanan alimlər arasında İmam əl-Muzəni'nin də adı zikr olunur. Məclisdən biri qalxaraq onun Quran barədə əhli-sünnətə müxalif olduğunu söyləyir, məclis əhli bu xəbərdən çox üzülürlər və bunu imamın özündən dəqiqləşdirmək üçün ona risalə yazırlar. İmam əl-Muzəni də cavab olaraq bu risaləsini yazır, haqqında söylənilən fikrin batil və əsassız olduğunu söyləyir, etiqad etdiyi prinsiplər haqqında xəbər verir.

**Qeyd: Tərcümə zamanı mötərizə içində yazacağım yazılar, eləcə də haşiyədəki, dipnotdakı açıqlamalar müəllifin deyil, oxucunun düzgün anlaması məqsədilə yazdığım öz sözlərimdir.**

İlk tam şəkilli tərcümə işim olan bu tərcüməmi insanlar arasında üzərimdə ən böyük haqq sahibi olan iki cahan sərvəri, rəhbərimiz, imamımız, ulu öndərimiz Allah rəsuluna - salləllahu aleyhi və səlləm - hədiyyə edirəm. Allahın salamı, rəhməti və bərəkəti onun, onun əhli-beytinin, səhabələrinin və qiyamətə qədər onların yolu ilə gedənlərin üzərinə olsun. Amin!

*Əşyab əl-Qubavi*

**Bismilləhir-Rahmənir-Rahim**

( İzzud-Din Əbu Muhəmməd Abdur-Razzaq bin Rizqilah ər-Rasəni əl-Hənbəli dedi: ) Fəqih İmam Şəmsuddin Əbul-İzz Yusuf bin Ömər bin Əbi Nasr əl-Həkkari (hicri) altı yüz on altıncı ildə səfər ayında bizə xəbər verdi və dedi: Sələfin qalığı əş-Şeyx, əl-İmam, əl-Hafiz, əs-Siqa Əbu İshaq İbrahim bin Osman bin İsa bin Dirbas əl-Mərani öz ləfzi ilə Mosul şəhərində altı yüz on birinci ildə, cəmadul-ulə ayının on doqquzu bizə rəvayət etdi və dedi: Saleh alim Şeyx Əbu Abdilləh Muhəmməd bin Əhməd bin Həmd bin Mufərrac bin Ğiyas əl-Ərtahi Misirdəki Fustat şəhərində mənim ona oxumağım surətilə bizə xəbər verdi və dedi: Musnid[2] alim Şeyx Əbul-Həsən Əli bin əl-Hüseyn bin Ömər əl-Məusuli əl-Fərra mənə (rəvayət etməyim üçün) izn verdiyi ( risalədə ) bizə xəbər verdi:

[ ح ][3] Şeyx İbrahim bin Osman[4] dedi: əl-Fəqih, əl-İmam, əl-Hafiz Şeyx Əbu Tahir Əhməd bin Muhəmməd bin Əhməd bin Muhəmməd bin İbrahim bin Siləfə əl-İsbəhani əs-Siləfi beş yüz yetmiş dördüncü ilin rabiul-axir ayında İskəndəriyyədən bizə yazdığı məktubunda bizə xəbər verdi və dedi: əş-Şərif Əbu Muhəmməd Abdul-Məlik bin əl-Həsən bin Bitinnə əl-Ənsari dörd yüz doxsan doqquzuncu ildə Məkkədə mənim ona oxumağım yolu ilə bizə xəbər verdi:

Hər ikisi də dedi[5]:

---

[2] Musnid hədis alimlərinə verilmiş bir tituldur. Adətən ən məşhur hədis kitablarını rəvayət edən və başqalarına da rəvayət etmək üçün öz sənədi ilə izn verən alimlərə musnid deyirlər. Misal üçün Şeyx Vəliyulllah əd-Dəhləvi öz zamanında Hindistanın musnidi kimi tanınmışdır.

[3] Alimlər rəvayət elmində bir çox rəmzlər icad ediblər. Bu rəmzlərdən biri də ərəb dilindəki "ح" hərfidir. Rəvayət edən alimlər çox zaman eyni rəvayəti birdən çox yoldan rəvayət edirlər. Ona görə də paralel sənədlər arasında fərq qoymaq üçün bir yol ilə gələn sənədi zikr etdikdən sonra bu rəmzi işarə edirlər və sonra paralel sənədi qeyd edirlər. Bizim bu kitabın rəvayəti isə gördüyümüz kimi bir hissəsində iki yoldan rəvayət edilir. Şeyx İbrahim bin Osman əl-Mərani bunu birinci Muhammməd bin Əhməd əl-Ərtahi yolu ilə, sonra isə Əbu Tahir əs-Siləfinin yolu ilə rəvayət etmişdir. Həm əl-Ərtahi, həm də əs-Siləfi onun şeyxləridir. Sənədləri qarşılaşdırdıqda bunu asanlıqla anlayacaqsız.

[4] Yuxarıda sənəddə adı keçən əl-Mərani'dir.

[5] Yəni həm Şeyx Əli bin əl-Hüseyn əl-Məusuli əl-Fərra, həm də əş-Şərif Abdul-Məlik bin əl-Həsən əl-Ənsari dedi.

Əbu Abdilləh əl-Hüseyn bin Əli ən-Nəsəvi əl-Fəqih – Məkkəyə yanımıza gəlmişdi – bizə xəbər verdi: Əbu Muhəmməd İsmail bin Rəca bin Səid əl-Asqaləni mənə Asqalən[6] şəhərində xəbər verdi: Əbul-Hüseyn Muhəmməd bin Əhməd bin Abdir-Rahmən əl-Malti və Əbu Əhməd Muhəmməd bin Muhəmməd bin Abdir-Rahim əl-Qeysərani mənə xəbər verdi: Hər ikisi də dedi: Əhməd bin Bəkr əl-Yəzuri bizə xəbər verdi və dedi: əl-Həsən bin Əli əl-Yəzuri əl-Fəqih mənə rəvayət etdi: Əli bin Abdilləh əl-Həlvani mənə rəvayət etdi və dedi:

Məğribin Tarablus[7] şəhərində idim. Mən və əshabımız sünnəti (yəni doğru inancı) zikr edirdik ki, axırda əl-Müzəni'ni də – rahimahullah - zikr etdik. Əshabımızdan biri dedi: "Mənə çatıb ki, o, Quran haqqında danışır və bu barədə susur[8]. Başqa birisi isə onun bunu[9] dediyini zikr etdi. Ta ki, başqa insanlar da bizə qoşuldu. Bu (xəbər) insanları çox şiddətli şəkildə kədərləndirdi. Ondan (bu barədə) öyrənmək istəyi ilə ona bir məktub yazdıq. (Cavab olaraq) bizə qədər, irca, Quran, yenidən diriliş, axirətdə toplanma, mizan tərəziləri və ictihad barədə "Şərhu-s-Sunnə" (risaləsini) yazdı. (Bu cür) yazdı:

**Bismiləhir-Rahmənir-Rahim**

Allah bizi və sizi təqva üzərə qorusun və bizi və sizi doğru yola yönəlmədə müvəffəq etsin! Sonra isə:

Sünnətdən ( düzgün əqidə, etiqad ) ona sarılmaq üçün nəfsinə səbr öyrədən, onun vasitəsilə fərqli fikirlərdəki şübhələri, zəlalət əhlinin uydurduğu işlərdəki azğınlıqları səndən uzaqlaşdıran bir şeyi sənə izah etməmi istədin. Sənə açıq-aşkar bir minhəc izah etdim ki, orada özümə və sənə nəsihət etməyi ehmal etmədim. (Bu yazımı) rüşd[10] və təsdid[11] sahibi Allaha həmd etməklə başladım.

Zikr olunmağa ən layiq, şükr edilməyə ən layiq olan Allaha həmd edir, Ona səna gətirirəm.

1. (Allah) Təkdir, Saməddir[12]. Onun nə qadın yoldaşı, nə də oğlu vardır. Bənzəri olmaqdan uzaq və uludur. Onun bənzəri və dəngi yoxdur. Eşidəndir, Görəndir, Biləndir, hər şeydən Xəbərdardır. Yenilməz və Yüksəkdir.

---

[6] İndi yəhudilərin işğalı altında qalan və yəhudilərin Aşkelon adlandırdıqları qədim müsəlman şəhəridir.
[7] Müasir Liviyanın paytaxtı Tripoli
[8] Yəni Quranın məxluq olub olmaması haqqında bir şey demir.
[9] Yəni Quranın məxluq olduğunu
[10] Doğru yol
[11] Yol göstərmə, istiqamətləndirmə
[12] Yəni heç nəyə ehtiyac duymayan,hər şeyin ona ehtiyac duyduğudur

2. Ərşin üzərinə (Özünün istədiyi kimi, ona layiq tərzdə) yüksəlmişdir və elmi ilə yaratdıqlarına yaxındır.

3. Elmi hər şeyi əhatə etmişdir. Yaratdıqları üzərinə əvvəlcədən yazılmış qədəri uyğulamışdır. **"Xain** (baxan) **gözləri və qəlblərin gizlədiyini bilir."**[13] Yaranmışlar Onun (olacaqları əvvəlcədən bilən, olayları olmadan öncə qabaqlayan) sabiq elmi ilə əməl edirlər. (Allah ) onları xeyir və şərdən ibarət hansı məqsəd üçün yaratmışdırsa yaradılanlar onu icra edirlər. (Etdikləri) itaətdən (Allahın izni olmadan) özlərinə bir fayda verməyə, (yenə Allahın izni olmadan) özlərindən bir günahı uzaqlaşdırmağa qadir deyillər. Yaradılmışları onlara heç bir ehtiyac duymadan öz istəyi ilə yaratmışdır.

4. Mələklərin hamısını (Özünə) itaət (etmələri) üçün xəlq etmiş, onları fitri olaraq (Özünə) ibadət üzərə yaratmışdır. Onlardan elə mələklər vardır ki, Onun qüdrəti ilə Ərşi daşıyırlar və onlardan bir digər qrup isə ərşinin ətrafında təsbih edirlər[14]. Digərləri də (Ona) həmd gətirərək Onu təqdis[15] edirlər. Onlardan (insan) elçilərinə (göndərmək üçün) elçilər seçmişdir. Bəziləri də Onun (əmr etdiyi) işlərini idarə edirlər.

5. Sonra Adəmi əliylə yaratdı və onu cənnətinə sakin etdi. Bundan öncə isə onu (Adəmi) yer üçün (orda yaşaması üçün) yaratmışdı. Ona bir ağacdan (meyvə yeməyi) qadağan etdi ki, ondan (meyvə) yeyəcəyini qədərində daha əvvəl yazmışdı. Sonra onu qadağan etdiyi işlə sınağa çəkdi. Sonra düşməni (İblisi) onun üzərinə musallat etdi, buna görə də onu (ağacdan meyvə yeməklə) aldatdı. (Allah) ondan yeməsini yer üzünə (düşməsinə) səbəb etdi. (Adəm - əleyhissalam - ) onun (meyvəsindən) yeməkdən qurtulmaq üçün heç bir yol, ondan çəkinəcək heç bir imkan, çıxış yolu tapmadı.

6. Sonra onun zürriyətindən Cənnət üçün sakinlər yaratdı və onlar Onun diləyi ilə onun (cənnətin, cənnət əhlinin) əməlləriylə əməl edirlər, Onun qüdrəti və istəyi ilə (haqlarında yazılmış əməlləri) həyata keçirirlər.

Yenə onun zürriyyətindən Od üçün də sakinlər yaratdı, onlara gözlər yaratdı ki, onunla (haqqı) görə bilmirlər, onlara qulaqlar yaratdı ki, onunla (haqqı) eşidə bilmirlər, onlara qəlblər yaratdı ki, onunla (haqqı) anlaya bilmirlər. Onlar bununla haqq yoldan əngəllənmişlər. Sabiq qədəri ilə (orada yazdığı kimi) Od əhlinin əməlləri ilə əməl edirlər.

---

[13] Ğafir, 19
[14] Allahı təsbih etmək Onu bütün nöqsanlardan pak etməkdir, bütün eyiblərdən uzaq tutmaqdır.
[15] Allahı təqdis etmək Onu müqəddəs tutmaq, ucaltmaqdır.

7. İman söz və əməldir. Bu ikisi biri birinin eynisi, biri birinə bağlı iki şey, iki ayrılmaz yoldaşdırlar. Onların arasında fərq qoymuruq. Əməlsiz iman, imansız da əməl yoxdur.

Möminlər imanda (biri birindən üstün olmaqla) fərqlənirlər, bəziləri digərlərindən çox saleh əməllər edirlər. Günahlar səbəbilə imandan çıxmırlar, masiyət və üsyan etməklə kafir olmurlar. Allah rəsulunun - salləllahu aleyhi və səlləm - Cənnəti (yəni oraya girməyi) haqlarında vacib gördüyü kəslərdən başqa xeyirxahlardan heç kəsin haqqında Cənnəti vacib görmürük[16] və pis əməl edənlər haqqında da (əminliklə) oda girəcəklərinə dair şahidlik etmirik.

8. Quran Allahın kəlamıdır, Ondan gəlmişdir. Məxluq deyildir ki, sonradan da yox olsun.

9. Allahın kəlimələri, Allahın qüdrəti, Onun vəsfi və sifətlərinin (hamısı) kamildir, məxluq deyildir, daimidir, əzəlidir. Sonradan yaranmamışdır ki, yox olsun. Rəbbimiz əvvəlcədən naqis deyildi ki, sonradan da (sifətləri ilə) artsın.

Sifətləri yaranmışların sifətinə bənzəməkdən uludur. Vəsf edənlərin zəkaları (Onu vəsf etməkdən) acizdir. (Ondan bir şey) istənildikdə cavabları ilə yaxındır. İzzətli olması ilə (məxluqatdan) yetişilməyəcək dərəcədə uzaqdır. Ərşi üzərinə yüksəlmişdir, yaratdıqlarından ayrıdır. Mövcuddur, yox və itkin deyildir.

10. Yaranmışlar ruziləri bitdikdə, ömürləri sona yetdikdə öz əcəlləri ilə ölürlər.

11. Sonra onlar (məzardakı) basıncdan sonra, qəbirdə (Allah, din və peyğəmbər haqqında) soruşulacaqlar.

12. Çürüdükdən sonra dirildiləcəklər. Qiyamət günü Rəblərinin (hüzuruna) toplanılacaqlar. Ərz meydanında, mizanların olduğu yerdə, Allahın sayıb hesaba aldığı, onların isə unutduğu (əməllərinin yazılmış olduğu) divanların səhifələrinin açılıb ortaya qoyulduğu zaman, yaratdıqları arasında Allahdan başqa birinin hakim olacağı təqdirdə[17] **"əlli min il miqdarında olan gündə"**[18] Ona (Allaha) hesab verəcəklər. Lakin Allah ədaləti ilə onlar arasında dünyadakı qaylulə vaxtı[19] miqdarındakı vaxt çərçivəsində hökm verəcək. **"O, hesaba çəkənlərin ən tez hesaba çəkənidir"**[20] Onlar üçün bədbəxtçilik və səadətdən (ibarət bir həyat) başlatdığı kimi,

---

[16] Yəni peyğəmbərin – salləllahu aleyhi va səlləm – xəbər verdiklərindən başqa heç bir kimsənin Cənnətə girəcəyinə dair bir şahidlik etmirik.
[17] Yəni əgər Allahdan başqası o gün hakim olsa, o günün sorğu-sualını bir başqası etsə əlli min il çəkər.
[18] əl-Məaric, 4
[19] Zöhrdən sonra yatın dincəlmək üçün qısa bir vaxt və ya zöhrlə əsr arasında olan vaxt
[20] əl-Ənam, 62

o gün də (Allaha) dönəcəklər. **”Bir qism Cənnətdə, digər bir qism isə Səirdə”**[21] olacaq.

13. O gün Cənnət əhli Cənnətdə nemət bolluğu içində olacaqlar. Cürbəcür ləzzətlər içində olacaqlar. Ən fəzilətli kəramət ilə xoş vaxt keçirəcəklər.

14. O zaman onlar Rəblərinə baxacaqlar. Ona baxmaqda heç bir sıxıntı çəkməyəcəklər və (Onu gördüklərində) şəkk etməyəcəklər. Üzləri (Allahın) kəraməti ilə parlayacaq, gözləri (Onun) fəziləti ilə daimi qalıcı nemət içində ona baxacaqdır. **”Onlara orada** (Cənnətdə) **heç bir yorğunluq toxunmaz, onlar oradan çıxarılmazlar”**[22] **”Yeməkləri daimidir. Həmçinin kölgəsi də. Bu**, (Allahdan**) qorxanların aqibətidir. Kafirlərin aqibəti isə oddur.”**[23]

İnkar əhli isə, həmin gün Rəbləri ilə onların arasında pərdə çəkiləcək, odda yandırılacaqlar. “**Nəfslərinin onlara təqdim etdiyi** (əməllər) **nə pisdir** (ki, bununla) **Allah onlara qəzəb etmişdir. Onlar əzabda əbədi qalacaqlar.”**[24] **”Canları alınmaz ki, ölsünlər, onun əzabından heç bir şey onlar üçün yüngülləşdirilməz, hər azğın kafiri bu cür cəzalandırarıq.”**[25] Allahın, ondan (oddan) çıxarmaq istədiyi muvahhidlər isə müstəsnadır.

15. Əmir sahiblərinə, Allah qatında razı qalınacaq şeylərdə itaət və Allah qatında qəzəblə qarşılanacaq şeylərdən çəkinmək (vacibdir). Hədlərini aşdıqda və zülm etdikdə[26] onlara qarşı baş qaldırmağı tərk etmək, onlar vasitəsilə rəiyətlərinə rəhm etməsi üçün Allaha tövbə etmək (lazımdır)[27].

16. Qiblə əhlinin təkfirindən çəkinmək, zəlalət çıxarmadıqları müddətcə çıxardıqları bidətlərdə onlardan (bidətləri miqdarında) uzaqlaşmaq lazımdır. Onlardan kimi bir zəlalət çıxararsa[28] qiblə əhlinə qarşı çıxmış və dindən ayrılmışdır. Ondan uzaqlaşmaqla Allaha yaxınlaşılır. O kəs tərk olunar və alçaldılar. Xəstəliyindən (bidətindən) uzaq durular. Onun xəstəliyi (bidəti) quduzluq xəstəliyindən daha təhlükəlidir.

---

[21] əş-Şura, 7; Səir cəhənnəmin adlarından bir addır.
[22] əl-Hicr, 48
[23] ər-Rad, 35
[24] əl-Maidə, 80
[25] Fatir, 36
[26] Burada zülm deyildikdə küfr olmayan zülm qəsd olunur, çünki aşkar küfr olan işlər görən bir əmr sahibini istənilən yolla vəzifədən kənarlaşdırmağın fərz olmasında ümmətin alimləri icma ediblər.
[27] Çünki başımıza gəlmiş zalım əmirlər cəmiyyətin içində cərəyan edən zülmlərin əsk-sədasıdır və Allah öz günahlarımıza görə zalım əmirləri başımıza musallat edir. Ona görə də sələfdən bir çox alim deyərdi ki, zalım əmirlər Allahın ədalətini yerinə yetirirlər. Tövbə edərək insanlar öz zülmlərindən qurtulsalar, zalım əmirlərdən də qurtulmaq üçün Allah onlara yol göstərər və onlar üçün bunu asanlaşdırar.
[28] Küfr və şirk olan bir zəlalət çıxararsa

17. Allah rəsulunun - salləllahu aleyhi və səlləm - xəlifəsi olan Əbu Bəkr əs-Siddiqin fəzilətli olmasına etiqad etmək lazımdır. O, peyğəmbərdən - salləllahu aleyhi və səlləm - sonra insanların ən xeyirlisidir[29]. İkinci olaraq (fəzilətdə) əl-Fəruqu zikr edirik. O, Ömər bin əl-Xattabdır. Onların ikisi Allah rəsulunun - salləllahu aleyhi və səlləm - vəzirləri və qəbir yoldaşlarıdır. Üçüncü olaraq (fəzilətdə) Zun-Nureyni, Osman bin Affanı zikr edirik. Sonra isə fəzilətdə və təqvada Əli bin Əbi Talib gəlir. Allah hamısından razı olsun.

(Bu dördündən) sonra (fəzilətdə) Allah rəsulunun Cənnətlə müjdələdiyi on nəfərdən yerdə qalanlardır. Onların hər birinə qarşı və sonra onlardan sonra gələn digər səhabələrə qarşı Allah rəsulunun - salləllahu aleyhi və səlləm - təyin etdiyi fəzilət miqdarında səmimi sevgi bəsləyirik. Allah onların hamısından razı olsun!

Onların fəzilətli olmaları etiqad edilməli, etdikləri xeyir əməlləri ilə yad edilməlidirlər. Aralarında çıxan ixtilaflar barədə (danışmağa) dalmaqdan çəkinirik. Onlar peyğəmbərlərindən sonra - salləllahu aleyhi və səlləm - yer əhlinin ən xeyirliləridirlər. Allah – Azzə va Cəllə - Öz peyğəmbərinə (səhabə olmaqları üçün) onlardan razı qalmışdır və onları dininin yardımçıları olaraq yaratmışdır. Onlar bu dinin imamları, müsəlmanların ən bariz şəxsiyyətləridirlər. Allah onların hamısından razı olsun!

18. Cümə namazında iştirak etməyi tərk etmirik. Bu ümmətin xeyirxahı və faciri arxasında – bidətdən[30] təmiz olduğu müddətdə - cümə namazını qılmaq lazımdir.[31] Əgər bir zəlalət çıxararsa arxasında namaz qılınmaz. Ədalətli və ya zalim başçı ilə cihad və həcc də (edilməlidir).[32]

19. Səfərlərdə namazı qısaltmaq, oruc tutmaq ilə oruc tutmamaq arasında seçim etmək (sünnətdəndir), diləsə oruc tutar, diləsə tutmaz.

20. Bu sözlər və fellərin üzərində keçmiş və əvvəlki hidayət imamları ittifaq ediblər. Allahın müvəffəqiyyəti ilə tabe olanlar özlərinə ibrət götürərək və razı qalaraq bunlardan sarılmışlar. Çəkindirildikləri şeylərdə ağır yük altına girməkdən uzaq

---

[29] Əbu Bəkr əs-Siddiq Peyğəmbərdən, eləcə də bütün peyğəmbərlərdən sonra ən xeyirlidir. Müəllifin onu digər peğəmbərlərdən istisna etməməsinin səbəbi yalnız Muhəmməd ummətini qəsd etməsidir; yəni Muhəmmədin – salləllahu aleyhi va səlləm - ummətinin peyğəmbərindən sonra ən xeyirlisi Əbu Bəkrdir.

[30] Küfr və şirk bidətindən

[31] Facirin arxasında namaz qılmaq ilə qəsd olunan budur ki, namaz qıldıran imam facir olarsa bu fücuruna görə arxasında namaz qılmağı tərk etmək olmaz. Yoxsa facirin arxasında namaz qılmaq vacibdir sözündən məqsəd gəzib dolaşıb harda facir imam varsa onun arxasında namaz qılmaq deyildir. Əksinə təqva sahibi olan yerdə facirin deyil, onun arxasında namaz qılmaq lazımdır. Facir sözü ilə böyük küfr sahibi deyil, küfrə düşməmiş fasiq müsəlmanlar qəsd olunur.

[32] Bu cür klassik əqidə mətnlərində zalım imamlar sözü ilə qəsd olunanlar müəlliflərin öz zamanlarında mövcud olmuş zalım əmirlər və xəlifələrdir, yoxsa müasir dövrdə qeyri-şəriət ilə hökm edən, namaz qılmayan, kafirləri özünə dost edən rəhbətlər bu ada daxil deyildirlər, çünki onların etdikləri aşkar küfrdür.

durmuşlar. Allahın yardımı ilə doğru yola yönəldiliblər və müvəffəq ediliblər. (Haqq yola) tabe olmaqdan üz döndərməyiblər ki, qüsurlu olsunlar. Ona artırmaqla təcavüz etməyiblər ki, hədlərini aşmış olsunlar. Biz də Allaha güvənir, ona təvəkkül edir, onların yoluna tabe olmamızı Ondan istəyirik.

21. 22. Bu, Sünnətin (doğru əqidənin, düzgün etiqadın) şərhidir. Onu açıqlamağa çalışdım və izah etdim. Allah kimi bu bəyan etdiyimə əməl etməklə bərabər nəcasətə (bulaşmaqdan) ehtiyat etməklə fərzləri əda etməyə, itaət olan əməllər üçün kamil dəstəmaz almağa, namazları imkan daxilində əda etməyə, var-dövlət sahibləri zəkat verməyə, var-dövlət və imkan sahiblər həcc etməyə, sağlam kəslər ramazan orucu tutmağa, Allah rəsulunun - salləllahu aleyhi və səlləm - sünnət olaraq qoyduğu beş namazı, hər gecə vitr namazını, sübh namazının iki sünnətini, ramazan və qurban bayramı namazlarını, əgər baş verərsə günəş və ay tutulması namazlarını, ehtiyac olduqda (quraqlıqda) istisqa (yağış istəyi) namazını qilmağa, haramlardan çəkinməyə, (fitnə yaymaq üçün) söz aparıb gətirməkdən, yalandan, qeybətdən, haqsız yerə üsyandan, Allah haqqında bilmədiyini deməkdən çəkinməyə, qazancda, yeyəcəkdə, haramlarda, içəcəkdə, geyimdə diqqətli olmağa, şəhvətlərdən[33] çəkinməyə riayət etməsinə - (bilmək lazımdır ki, ) bunların hamısı ən böyük haramlardır və kim qoruq ətrafında otararsa hər an (sürü) qoruğa girə bilər[34] - müvəffəq edərsə, kimə bunları etməyi asanlaşdırılarsa, o, dindən olan doğru yol üzərədir, Allahın rəhmətindən (payının olmasına) ümid edə bilər.

Allah bizi və səni, bol və əzəli ehsanı, uca və ən kərəmli cəlalı ilə ən sağlam yoluna müvəffəq etsin! Bizə salam deyənlərə salam olsun! Zəlalət əhli Allahın salamından heç şeyə nail olmur.

Aləmlərin rəbbi olan Allaha həmd olsun!

Allahın həmdi və ehsanı ilə risalə başa çatdı. Onun bol-bol xeyir duası və salamı Muhəmmədin, onun ailəsinin, səhabələrinin və pak olan zövcələrinin üzərinə olsun!

---

[33] Haram olan nəfsani şəhvətlərdən

[34] Bu hədisdən bir parçadır. Allah rəsulu - salləllahu aleyhi və səlləm - hədisində şübhəli şeylərlə əməl edənləri qoruq ətrafında qoyun otaran birisinə bənzətməklə, həmən qoyunların qoruğu keçə biləcəyi kimi o insanın da harama girə biləcəyini izah edir. Müəllif də bu məqamda hədisin o qismini iqtibas etmişdir.